# ƏDƏBİ DİLİN NORMALARI

Dildə, eləcə də nitqdə norma tənzimləyici, nizamlayıcı funksiyanı yerinə yetirir, nisbi sabitliyi yaradır. "Norma" sözü latın dilindən alınmış termin olub mənası qayda, əsas, nümunə deməkdir. Dilin normaları olmadan ədəbi dil, ədəbi dil olmadan nitq mədəniyyəti yoxdur. Nitq mədəniyyətinin normaları yazılı və şifahi nitqin qaydalarından törəmişdir.

Ədəbi dilin normalarını pozanlar ictimaiyyət tərəfindən məzəmmət olunurlar. Fransa, Latviya və digər inkişaf etmiş ölkələrdə dil qanunlarını pozanlar hətta cəzalandırılır. Məhz bu normaların sayəsində nitqin bütün şəraitində - məişətdə, istehsalatda, ictimai-siyasi mühitdə, təhsildə və s. yerlərdə dil özünün müxtəlif ünsiyyət fəaliyyətini lazımi səviyyədə yerinə yetirə bilir. Ədəbi dilin normaları onun bütün səviyyəsini əhatə edir: fonetik normalar, leksik normalar, qrammatik normalar, orfoqrafik normalar, orfoepik normalar, üslub normaları.

# FONETİK NORMA

Dilçilyin bir bölməsi olan **fonetika** dilin səs sistemini, səs qanunlarını öyrənir. Ədəbi dilin səs sistemi müəyyən normalar əsasında tənzimlənir. Sözlər ümumxalq dilində müxtəlif şəkildə deyilsə də, ədəbi dildə ancaq bir variantda tələffüz olunur və yazılır. Sözün ədəbi dildəki tələffüz qaydası **orfoepik norma,** yazılış qaydası isə **orfoqrafik norma** adlanır. Orfoepik və orfoqrafik normalar birlikdə dilin fonetik quruluşu ilə müəyyənləşir və fonetik normanı təşkil edir.

Orfoqrafiya yazıda ikiliyin (müxtəlifliyin) qarşısını alır. Orfoqrafiya ilə orfoepiya arasında fərqi aradan qaldıran, onları bir-birinə yaxınlaşdıran fonetik prinsipdir. Dilimizdə bir sıra sözlərin tələffüzü ilə yazılışı arasında müəyyən fərqlər mövcuddur. Elə sözlər vardır ki, onları tələffüz edildiyi kimi yazmaq, yaxud yazıldığı kimi tələffüz etmək səhvdir. Beləliklə, fonetik norma iki formada özünü göstərir: sözün düzgün tələffüz forması (orfoepiyası) və düzgün yazılış forması (orfoqrafiyası).

**Orfoepik norma** düzgün ədəbi tələffüzü müəyyənləşdirən qaydalar sistemi, tələffüz qaydalarını gözləmə anlamındadır.

**Orfoqrafik norma** düzgün yazılış qaydaları sistemi, yazı qaydalarının öyrənilməsi mənasında işlənir. Orfoepik yaxud orfoqrafik norma pozulursa, nəticədə fonetik norma pozulmuş olur. Bir fikir qəti şəkildə aydınlaşdırılmışdır ki, danışdığımız kimi yazmaq yazıda hərc-mərclik yaratdığı kimi, yazdığımız kimi danışıq da nitqimizdə bayalığa, "quruluğa" gətirib çıxarır.

# Orfoqrafik normalar

**Orfoqrafiya** yunan sözü olub orhos doğru, düzgün, qraphos yazıram deməkdir. Bu, orfoqrafiyanın lüğəvi mənasıdır. Onun bir termin kimi mənası söz və qrammatik formaların vahid və sabit yazı qaydalarının məcmusu, toplusu deməkdir: “Orfoqrafiya – yazılı dil vahidlərinin yazılışını təmin edən qaydalar sistemidir”.

**Hərflərin əvəz olunması ilə bağlı qüsurlar:**

**a) alınma sözlərin vurğusuz** hecasında o əvəzinə tələffüzə uyğun olaraq a yazılması. Məsələn, fantan, paraxod, mantyor, prakuror, marfalogiya, kansert, kamanda və s.;

**b) sözün ikinci hecasında** saitin tələffüzə uyğun yazılması. Məsələn, mühüt (mühit), münbüt (münbit), müdür (müdir) və s.;

**c) kar samitlərin** cingiltili samitlərlə əvəzlənməsi. Məsələn, dəfdər, asdar, hətda, əlbətdə, kəşviyyat, şafdalı, resbublika, Müşviq, bitgi və s.;

**ç) sözlərdə cingiltili** samitlərin kar samitlərlə əvəz olunaraq yazılması. Məsələn, armut, palıt, qoçax, əhənk, həsət, kənt, qənt, aftomat, aftobus, şüphəsiz və s.;

**d) söz ortasında** cingiltili samitlərin əvəzlənməsi. Məsələn, təmbəl, şəmbə, gümbəz, görümməz, mümbüt (münbit) və s.;

**e) sözlərin ortasında** kar samitdən əvvəl gələn q samitinin k ilə yazılması. Məsələn, rəks (rəqs), iktidar (iqtidar), məksəd (məqsəd), nöksan (nöqsan), Oktay (Oqtay) və s.

**Adi danışıq dili və yerli şivəyə xas olan qüsurlar:**

**a) adi danışıq dilinə** məxsus qüsurlar. Məsələn; Məsələn; pılan, hərif, tərbiyyə, heysab, haçar (açar), zülüm, məhşur, istəkan, hökmət, doğurdan, təcürbə, hasan (asan), hindi (indi), əvəl (əvvəl), qüvət, işqaf, ustul (stul), telfun, şikil, sutun və s.

**b) yerli şivəyə məxsus** olan orfoqrafik səhvlər. Məsələn; mişar, aton, nənön, ineg, boba, qalistok, kinova, alıtımış, tusbağa, midalyon, xüsüsi, manıt, qırıx (qırx), tırp, hayva, dəyil, bajı, dəyşət, öysürmək, çərçin (gərqin), dəgirmi (dəyirmi), səhrəd (sərhəd), ürdək, cüclü (güclü) və s.

**Saitlərin yazılışı**

**1**. O saiti alınma sözlərin vurğusuz hecasında a və ya o ilə deyilməsindən asılı olmayaraq o ilə yazılır: avtomat, biologiya, velosiped, ensiklopediya, kollektiv,

kombinat, laborant, obyekt, poeziya, poema, poçtalyon, problem, professor, solist, motor, polkovnik.

**2**. Ü saitli alınma sözlər ü ilə də yazılır: alüminium, bülleten, büro, jüri.

**3**. Aşağıdakı sözlər ədəbi tələffüzə uyğun olaraq iki heca ilə yazılır: qəbir, qədir, eyib, ətir, zehin, isim, nəsil, ömür, səbir, sətir, sinif, fəsil, şəkil, heyif, meyil, əsil, şeir...

**Samitlərin yazılışı**

**1.** Birinci hecasındakı samiti həm n, həm də m ilə deyilən sözlər n ilə yazılır: anbar, qənbər, zənbil, günbəz, sünbül, şənbə...

**2.** Əslində sonu qoşasamitlə bitən iki və ya çoxhecalı sözlər bir samitlə yazılır: ekspres, kilovat, kiloqram, konqres, metal, mühüm, proses, sərhəd, hüsnxət

**Sözün müxtəlif yerlərindəki qoşa sait və samitlərin yazılışı**

**3**.Qoşa saitlə deyilən sözlər qoşa saitlə də yazılır: maaş, saat, camaat, bədii, əmtəə...

**4.** Təkhecalı sözlərin sonunda qoşa samitin hər ikisi yazılır: vatt, zənn, zidd, küll, rədd, sirr, fənn, xətt, haqq, hiss... Bu sözlərə samitlə başlanan şəkilçi əlavə olunduqda söz kökündəki qoşa samitdən biri düşür: sir-daş, fən-lər, xət-siz, haq-sız...

**5.** İki sait arasında gələn qoşa samitlər olduğu kimi yazılır: ballada, kassa, şassi, vassal, kapella, klassik, libretto, operetta, nəqqaş, səyyar, kəmiyyət... Qeyd. Qruppa, antenna, tonna, apparat, parallel sözləri və -ma hecası ilə qurtaran sözlər aşağıdakı kimi yazılır: qrup, antena, ton, aparat, paralel, diaqram, proqram, stenoqram, teleqram...

## Şəkilçilərin yazılışı

**Sözdüzəldici şəkilçilər aşağıdakı kimi yazılır:**

**Bir cür yazılan şəkilçilər**:

**1)** –i və ya –vi şəkilçisi: daxili, tarixi, həyati, cənubi, şimali, dairəvi, kimyəvi, kütləvi, Gəncəvi...

**2)** –vari şəkilçisi: buynuzvari, qalxanvari, yüngülvari, üzükvari. İki cür yazılan şəkilçilər: kar samitlə bitənlərdə -qan, -kən; cingiltili samitlə bitənlərdə -gan, -gən şəkilçiləri: yapışqan, çalışqan, döyüşkən, sürüşkən, burulğan, deyingən...

**Dörd cür yazılan şəkilçilər:**

**1)** –ki, -kı, -ku, -kü şəkilçisi: axşamkı, bildirki, səhərki, onunku, gündüzkü, bugünkü...

**2)** sifət və isim düzəldən –ı, -i, -u, -ü şəkilçisi: badımcanı, darçını, narıncı, dərbəndi, çərkəzi, novruzu, gümüşü...

**3)** fel köklərindən isim və sifət düzəldən şəkilçilər: sonu kar samitlə bitənlərdə:

**a)** –kı, -qı, -kü, -qu: bıçqı, seçki, pusqu, sürtkü...

**b)** –kin, -qın, -kün, -qun: bitkin, satqın, ötkün, tutqun...

**4)** –stan şəkilçisi samitlə bitən sözlərə qoşularkən samitlər arasına sait artırılır: Dağıstan, Türkmənistan, Monqolustan, Türküstan..

**Qeyd:** Saitlə bitənlərdə -stan yazılır.

**Birinci hərfi böyük yazılan sözlər**

**1. Xüsusi isimlərin** (yardımçı sözlərdən başqa) birinci hərfi böyük yazılır: Səməd Vurğun, Üzeyir bəy Hacıbəyli, Uzun Həsən, Süleyman Rüstəm, Süleyman Sani, Bəxtiyar Vahabzadə.

**2. Bədii əsərlərdə** heyvanlar və cansız əşyalar surət kimi işlədildikdə onların adlarının birinci hərfi böyük yazılır: Qırat, Alapaça, Bozdar, Məstan...

**3. Tarixi hadisələrin,** dövlətlərin, sülalələrin, nomenklatur terminlə işlənən yer adlarının, eləcə də qədim yazılı abidələrin və s. adlarının birinci sözünün birinci hərfi böyük yazılır: Vətən müharibəsi, Yeddiillik müharibə, Versal sülhü, Dəmir dövrü, Orxon-Yenisey abidələri, Sasanilər dövrü, Səfəvilər sülaləsi, Xəzər dənizi, Azadlıq meydanı, Şuşa qalası... Belə mürəkkəb adlara fərqləndirici söz əlavə olunduqda onun da birinci hərfi böyük yazılır: Orta Paleolit dövrü, Son Paleolit dövrü...

**4. Ölkələrin, muxtar respublikaların,** vilayət və diyarların rəsmi adlarının tərkibindəki bütün sözlərin ilk hərfi böyük yazılır: Azərbaycan Respublikası, Naxçıvan Muxtar Respublikası, Bakı Şəhər İcra Hakimiyyəti....

**5. Yüksək dövlət vəzifələri** (Azərbaycan Respublikasının Prezidenti, Azərbaycan Respublikasının Baş naziri, Azərbaycan Respublikası Milli Məclisinin Sədri), fəxri adlar, habelə nazirlik, komitə, birlik, cəmiyyət, qurum, akademiya, universitet, texnikum, teatr, filarmoniya, siyasi partiya, eləcə də tarixi günlərin və s. adlarının tərkibindəki bütün sözlərin (yardımçı sözlərdən başqa) birinci hərfi böyük yazılır:

Azərbaycan Respublikasının Milli Məclisi, Azərbaycan Respublikasının Nazirlər Kabineti, Azərbaycan Respublikasının Xarici İşlər Nazirliyi, Azərbaycan Milli Elmlər Akademiyası Nəsimi adına Dilçilik İnstitutu, M.Maqomayev adına Azərbaycan Dövlət Filarmoniyası

**6. Orden, medal, bədii əsər**, opera, balet, kinofilm, qəzet, jurnal, kinoteatr, mehmanxana, nəşriyyat, kafe, restoran, düşərgə, yeməkxana, mağaza və s. adları dırnaqla və böyük hərflə yazılır: “İstiqlal” ordeni, “Azərbaycan Bayrağı” ordeni, “Dəli Kür” romanı, “Yeddi gözəl” baleti, “Uzaq sahillərdə” filmi, “Azərbaycan” qəzeti, “Cücələrim” kafesi, “Bahar” mağazası, “Badamlı”, “İstisu” mineral suları... Qeyd: Dırnaqda yazılan belə adlara artırılan şəkilçi dırnaqdan kənarda yazılır: “Xalq qəzeti”nin bugünkü nömrəsi, “Yeddi gözəl”in ilk tamaşası.

**7. Mirzə, hacı, şeyx, seyid**, şah, soltan, ağa, bəy, bəyim, xan, xanlm və s. sözlər rütbə, ləqəb və titul bildirib sözlərdən əvvəl gəldikdə böyük, sözlərdən sonra gəldikdə isə kiçik hərflə yazılır: Mirzə Fətəli, Hacı Qara, Şeyx Nəsrullah, Seyid Əzim, Şah İsmayıl, Soltan Mahmud, Abbasqulu ağa, Fətəli xan, Heyran xanım...

**İxtisarlar (abreviaturlar)**

**1. İxtisarlar üç cür yazılır:**

**a) tam ixtisarlar** aid olduqları sözlərə (xüsusi və ya ümumi isimlərə) uyğun olaraq böyük və ya kiçik hərflə yazılır: AR (Azərbaycan Respublikası), BMT (Birləşmiş Millətlər Təşkilatı), MM (Milli Məclis), m. (metr), c. (cild)...

**b) yarımçıq ixtisarlar** aid olduqları sözlərə uyğun olaraq, böyük və kiçik hərflərlə, mürəkkəb adların tərkib hissələri isə bitişik yazılır: akad. (akademik), prof. (professor), Azərkitab (Azərbaycan kitabı), teletamaşa (televiziya tamaşası)... c) sözün orta hissəsinin düşməsi ilə yaranan ixtisarlar defislə yazılır: d-r (doktor), z-d (zavod)...

**2. İxtisarlara əlavə edilən şəkilçilər** onların son hecasına uyğun olaraq yazılır: MEA-dan, BMT-yə, MDB-nin ...

## Orfoepik normalar

Danışanların (eləcə də mətn əsasında oxuyanların) nitqində ədəbi tələffüzlə bağlı bir sıra qüsurlar özünü göstərir ki, onların iki forması daha xarakterikdir. Bunlardan birincisi, yerli şivə və adi danışıq dilinə məxsus qüsurlardır**. Nitqdə bəzən söz və qrammatik formalar yerli şivədə və ya adi danışıqda olduğu şəkildə tələffüz edilir.** Məsələn: həlbəttə, hasan, ahali, haçar, muraciət, genə (yenə), istəkan, işqaf, usdol (stol), qulup (klub), varağ (vərəq), dəyşət (dəhşət),

huquq (hüquq), qırıx (qırx), ilik (ilk), bajı (bacı), yanı (yəni), nöş (nə üçün), mıyı (bunu), dərmən (dərman), olsoydu (olseydi), əyyani (əyani), diqət (diqqət), doğurdan, tilvizir, döylü (deyil), direktır, qabul,, nərazılıq, belənçik, mübtadə, müsəlmançalıq, azreyil, ümümi, saydə (sadə) və s. Bu qəbildən olan orfoepik qüsurların bir qismi nitq prosesində uzun və qısa deyilən saitlərin düzgün işlənməməsi səbəbindən irəli gəlir. Məsələn: mədəni (adam) əvəzinə m[ə:]dəni (birinci hecada ə saitinin uzanması), bədii, təbii sözlərində ə saitinin uzadılaraq tələffüz olunması və s. **Tələffüz qüsurlarının digər bir qismi sözlərdə (daha çox alınma sözlərdə) vurğunun düzgün deyilməməsi nəticəsində baş verir.** Məsələn: İngiltə`rə, ope`ra, Xo`srov, nəzə`riyyə, ba`şqa, bü`tün, Qaraba`ğ, Lit`va, kafe`dra, sekto`r, kafe`l, bü`ro, kame`ra, si`fət, i`sim, ə`dat, da`ha, o`xu, mü`xtəlif, teo`rem, Çelyabi`nski, Pifa`qor, ə`sasən, e`tibarən, gü`norta, peda`qoq, fizi`ka, şu`ra, müx`təlif, a`rzu (edirəm) və s. **Ədəbi tələffüz normalarının pozulmasının ikinci halı orfoepiyası orfoqrafiyasından fərqli olan sözlərin yazıldığı kimi deyilməsi və oxunmasıdır.** Hərfi tələffüz (buna kitab tələffüzü də deyilir) bir sıra alınma sözlərin, həm də dilimizə məxsus söz və şəkilçilərin deyilişində (daha çox oxusunda) özünü göstərir. Alınma sözlərdə: məsələn: Lomonosov (Lamanosov əvəzinə), Moskva (Maskva əvəzinə), intonasiya (intanasiya əvəzinə), orfoqrafiya (arfaqrafiya əvəzinə) və s. **Dilimizə məxsus sözlərin və şəkilçilərin deyilişində:** məsələn: vicdan (vijdan əvəzinə), uşaq (uşax əvəzinə), məqsəd (məksəd əvəzinə), başlayır (başlıyır əvəzinə), dinləyirlər (dinliyirlər əvəzinə), qanlı (qannı əvəzinə), atamla (atamnan əvəzinə), görsə idi (görseydi əvəzinə) və s. Ədəbi tələffüzdən uzaqlaşmanın yuxarıda göstərilən formaları müəllimlərin danışıq və oxusunda da müşahidə olunur ki, bu şagirdlərin, tələbələrin yüksək nitq mədəniyyətinə yiyələnməsi işinə öz mənfi təsirini göstərir. Xüsusən, müəllimlərin ədəbi tələffüz baxımından qüsurlu danışığı ilə heç bir halda razılaşmaq olmaz. Ədəbi dilimizin qoruyucuları, təbliğatçıları, tənzimləyiciləri, yayıcıları olan müəllimlər düzgün tələffüz qaydaları əsasında danışmağı və oxumağı bacarmalıdırlar. Düzgün danışıq, nümunəvi tələffüz müəllimin ixtisasca hazırlığını, mədəni səviyyəsini səciyyələndirən başlıca göstəricilərdəndir. Müəllim biliyi, dünyagörüşü, davranışı, geyimi və s. ilə bərabər, öz nitqi (həm yazılı, həm də şifahi nitqi) ilə də başqalarına nümunə olmalıdır. Onun nitqində bir dənə də belə söz və ifadə pozğunluğuna yol verilməməli, danışıq və qiraəti öz aydınlığı, səlisliyi, axıcılığı, intonasiyaca zənginliyi ilə xoşagəlimli olmalı, diqqəti cəlb etməlidir. Bunun üçün müəllim, hər şeydən əvvəl, ədəbi tələffüz baxımından mədəni nitqə verilən tələbləri bilməli, öz danışıq və oxusunda onları gözləməlidir. Natiqdə, eləcə də hər hansı bir savadlı və mədəni adamda ədəbi tələffüz normaları əsasında danışmaq və oxumaq vərdişi birdən-birə yaranmır. Bunun üçün ciddi səy, möhkəm iradə, nitq üzərində müntəzəm işləmək tələb olunur. Natiq, hər şeydən əvvəl, nitq mədəniyyəti, o

cümlədən ədəbi tələffüz, intonasiya ilə bağlı dilçilik ədəbiyyatını, natiqlik sənəti və məharətinə dair yazılmış kitabları, məqalələri müntəzəm şəkildə mütaliə etməlidir.

# Azərbaycan dilində fonetik hadisə və qanunlar

Müasir Azərbaycan dilində fonetik normanın pozulmasına səbəb olan bir sıra fonetik hadisə qanunlar vardır. Onlar aşağıdakılardır**: 1) assimilyasiya, 2) dissimilyasiya, 3) səsartımı, 4)səsdüşümü, 5) yerdəyişmə**

**Assimilyasiya** səslərin məxrəc və akustik cəhətdən bir-birinə yaxınlaşıb uyğunlaşmasına deyilir. Məsələn, mən sözünü götürək. Bu sözə - dən şəkilçisi artırıldıqda sözün sonundakı n səsinin təsiri ilə şəkilçinin əvvəlindəki d səsi n səsinə keçir. Buna görə də həmin söz məndən əvəzinə, **mənnən** şəklində tələffüz edilir. Assimlyasiyaya uğramış sözlər: Səndən-sənnən, dinməz-dimməz, yavaşca-yavacca, sərinlik-sərinniy, onlar-onnar, şorlu-şorru,  atlar –atdar, gözlük-gözdük.

**Dissimilyasiya** - sözdəki eynicinsli səslərin birinin digərinə təsir edərək onu başqa səsə çevirməsinə dissimilyasiya deyilir. Məsələn, doqquz – dokquz, toqqa – tokqa, səkkiz – səkgiz və s.

**Səsartımı (proteza). D**anışıq dilində sözlərə saitlərin də artırılması geniş yayılmışdır, məsələn, dairə -dayirə, Nailə-Nayilə, ailə-ayilə və s.

Dialekt və şivələrdə də sözün əvvəlinə səs artırılmasına alınma sözlərdə daha çox təsadüf edilir. Məsələn: Rza əvəzinə İrza, rayon əvəzinə İrayon, stəkan-istəkanŞ Rusiyyət-Urusiyyət və s.

**Səsdüşümü - s**özdən bu və ya digər səsin düşməsinə səsdüşümü **(eliziya)** deyilir. Səsdüşümü həm saitlərdə, həm də samitlərdə müşahidə olunur. Lakin saitlərə nisbətən, samitlərin söz tərkibindən düşməsi azdır. Azərbaycan ədəbi və danışıq dilində səsdüşümü hadisəsi müxtəlif şəkillərdə təzahür edir. Nümunələr: İki –ikinci Altı –altıncı, yeddi- yeddinci, Mirzə Əli – Mirzəli, Ağa Əli – Ağəli, Əli Əsgər – Ələsgər, Əli İsa – Əlisa, müəllim-məllim, dovğa-doğa və s.

Sözün tərkibində səslərin bir-biri ilə yerini dəyişməsinə **yerdəyişmə (metateza)** deyilir; məsələn: Layihə – lahiyə – (yh – hy) Torpaq – topraq – (rp – pr) Fərhad – Fəhrad – (rh – hr) 45 Yanlış – yalnış – (nl – ln) Məşhur – məhşur – (şh – hş) və s. Yerdəyişmə dilimizdə geniş şəkildə yayılmamışdır.